faizi və kritik hallar ölkədən ölkəyə fərqlənirdi. 2572 amerikalı uşaq arasında təxminən 5,7%-i xəstəxanaya, onlardan 0,58%-i reanimasiya şöbəsinə yerləşdirilmişdi. ABŞ-da uşaqlar arasında hospitalizasiyanın ən yüksək faizini (15%) 1 yaşdan kiçik uşaqlar təşkil etmişdi. Çinli uşaqların demək olar ki, 6% -də, İspan körpələrinin 10% -də xəstəliyin gedişatı ağırdan kritik vəziyyətə qədər inkişaf etmiş və onlar reanimasiyaya yerləşdirilmişlər. Çinli uşaqlar arasında 2 ölüm (14 yaş və 10 aylıq), amerikalı uşaqlarda isə 3 ölüm hadisəsi baş vermişdir. Nəticə etibarı ilə uşaqların əksəriyyətində simptomlar arasında hərarət üstünlük təşkil edirdi (21). Şəkil 1-də ABŞ və Çindən olan uşaqlarda xəstəliyin klinik gedişatı göstərilmişdir.




**Şəkil 1. ABŞ və Çindən olan uşaqlarda xəstəliyin klinik gedişatı**

2020-ci ilin sentyabr ayına qədər Braziliyada 4,3 milyon Covid-19 hadisəsi, 821 uşaq və yeniyetmə olmaqla 135 000 ölüm qeydə alınmışdır (21).

Brazilyanın Şimal-Şəqr bölgəsində uşaqlar arasında ölüm sayının çox olmasının səbəblərini aydınlaşdırmaq üçün geniş tədqiqatlar aparılmışdır. Sergipe şəhərində 30 sentyabr 2020-ci ilə qədər 19 yaşdan kiçik uşaqlar arasında 6038 COVID-19 hadisəsi olduğu, onlardan 37-nin öldüyü bildirilmişdi. Sergipedə əhalinin 759 907 nəfəri 19 yaşa qədər uşaqlardır. Ştatda hər 100 000 uşaq sayına görə 4,87 ölüm nisbəti qeydə alınmışdır (22). Covid-19 xəstəliyinin yaş qrupları arasında yayılma sayı cədvəl 3-də göstərilmişdir.

**Cədvəl 3.**
**Covid-19 xəstəliyinin yaş qrupları arasında yayılma sayı**

| Yaş qrupu | Təsdiqlənmiş halların sayı | Ölüm sayı | Əhali | Ölümün nisbəti |
|---|---|---|---|---|
| **<1 yaş** | 98 | 15 | 34 016 | 15.31% |
| **1-4 yaş** | 935 | 4 | 136 606 | 0.43% |
| **5-14 yaş** | 2190 | 10 | 387 240 | 0.46% |
| **15-19 yaş** | 2815 | 8 | 202 045 | 0,29% |
| **Hamısı** | 6038 | 37 | 759 907 | 0.61% |

ABŞ-da Covid-19 əhalinin 22% -də, uşaqların isə 1.7%- də rast gəlinirdi. ABŞ-da tədqiqat dövründə 7256 xəstədən 424-də (5.8%) SARS-CoV-2 üçün müsbət nəticə vermişdir. Tədqiqatda xəstələrin 39%-ni 1-5 yaş aralığında olan uşaqlar təşkil edirdi. Uşaqların median yaşı 5,9 il hesablanmışdır. Cədvəldə uşaqların yaş qruplar arasında yoluxmanın nəticələri verilmişdir (23).

**Cədvəl 4.**
**Uşaqların yaş qruplar arasında yoluxmanın nəticələri**

| Yaş qrupu | Ümumi testlər | Müsbət testlər |
|---|---|---|
| 0-12 ay, n (%) | 1193 (16,4%) | 70 (16,5) |
| 1–5 il, n (%) | 2456 (33,8%) | 96 (22,6) |
| 6-11 yaş, n (%) | 1535 (21,2%) | 77 (18,2) |
| 12-17 yaş, n (%) | 1651 (22,8%) | 134 (31,6) |
| 18-21 yaş, n (%) | 421 (5,8%) | 47 (11.1) |
| kişi cinsi, n (%) | 3929 (54,3%) | 215 (50,7) |

İrqinə görə, qaradərili uşaqların 10,6%- da (226/2132), ağ rəngli uşaqların 3,3%-da (117/3592) PZR pozitiv nəticə olmuşdur. Uşaqlarda astma, piylənmə və zehni sağlamlıq pozğunluqları ən çox müşahidə olunan yanaşı xəstəliklər idi. Bəd xassəli şişlər və ya digər immun çatışmazlıq, hipertenziya və diabetes mellitus nadir hallarda qeyd edilirdi (24). Müayinə zamanı olan simptomlar öskürək, hərarət və nəfəs darlığı idi. 12 xəstənin vəziyyəti kritik olduğuna görə mexaniki ventilyasiya tələb olunurdu; yaşları 2 - 18 aralığında dəyişirdi. Xəstələrin 29%-i stasionar müalicə, 7%-i invaziv ventilyasiya almışlar. Bu araşdırmada SARS-CoV-2 infeksiyası ilə 2 ölüm hadisəsi təsdiqlənmişdi (25).

## Nəticə

Araşdırdığımız məqalələri dəyərləndirdikdə belə məlum olur ki, uşaqlar arasında Covid-19-a yoluxmada oğlanlar üstünlük təşkil edirdi. Xəstəliyin gedişatı əksər araşdırmalardakı uşaqlarda asimptomatik və yüngül simptomatik keçirdi. Simptomlardan ən çox rast gəlinən hərarət, öskürək, tənəffüs çətinliyi olmuşdu. Ölüm halları uşaqlar arasında azlıq təşkil edirdi. Araşdırdığımız ölkələr arasında ən çox ölüm halı Brazilyada qeydə alınmışdı (100.000 – 4.87%). Ölən uşaqlardan yalnız 3-də yanaşı gedən xəstəliklər var idi.

Uşaqlar yetkin şəxslərlə müqayisədə SARS–CoV-2 virusuna ailə üzvləri tərəfindən yoluxurlar, yeni doğulmuşlara isə, virusun şaquli (anadan uşağa) yolla ötürüldüyü müəyyən edilmişdir. SARS epidemiyasında olduğu kimi, SARS-CoV-2-də uşaqlar bu virusa az yoluxur, xəstəlik simptomları isə böyüklərə nisbətən yüngül keçir. Nəticə olaraq, uşaqlar müalicəyə yaxşı tabe olub, əsasən fəsadsız sağalırlar. Uşaqlar arasında 6 aya qədər olan körpələr (əsasən oğlanlar) xəstəliyin ağır formalarına həssasdırlar. Həmçinin, yanaşı gedən və əsas xəstəliyi olan uşaqlarda Covid-19-un şiddətli klinik gedişatının artması mümkündür.

## Ədəbiyyat

1. Zimmermann, Petra MD, PhD Curtis, Nigel FRCPCH, PhD COVID-19 in Children, Pregnancy and Neonates: A Review of Epidemiologic and Clinical Features doi: 10.1097/INF. 0000000000002700
2. Nina, K., Lorna, M., Anja, S., Sanja, F., Vladimir, T., Srdan, R., Goran, T. (2019). Epidemiological and clinical features of Croatian children and adolescents with a PCR-confirmed coronavirus disease: differences between the first and second epidemic wave https://www.ncbi.nlm.nih.gov/ pmc/articles/PMC7821366

3. Juan, J., Gil, M., Rong, Z., Zhang, Y., Yang, H. (2019). L C Poon Effect of coronavirus disease. (COVID-19) on the maternal, perinatal and neonatal outcome: systematic review DOI: 10.1002/ uog.22088
4. Laura, C., Carla, B., Martina, V., Daniela, F., Mariacarolina, S., Donatella, C., Chiara, G., Laura, P., Luigi, L., Natascia, I., Mohamad, M., Sandro, L., Marco, C. (2022). Sedentary lifestyle and precocious puberty in girls during the COVID-19 pandemic: an Italian experience Endocr Connect. Feb 14;11(2):e210650. doi: 10.1530/EC-21-0650.
5. Shamez, N., Ladhani, Zahin, C., Hannah, G. Davies, A., Iain, H., Joanne, L., Mary, S., Simon D., Heather, W., Nick, A., Maria, Z., Susan, H., Mary, R. COVID-19 in children: analysis of the first pandemic peak in England http://dx.doi.org/10.1136/archdischild-2020-320042
6. Niccolo Parri, Anna Maria Magistà, Characteristic of COVID-19 infection in petiatric patients: early findings from two Italian Pediatric Research Networks https://link.springer.com/article/10. 1007/s00431-020-03683-8
7. Dinagul, B., Riza, B., Bayan, T., Ildar, F., Timur, S., Shynar, T. COVID-19 in the paediatric population of Kazakhstan https://doi.org/10.1080/20469047.2020.1857101
8. Burcu, Y., Yasemin, O., Kubra, A., Pembe, O., Sibel, G., Sare, I., Musa, K., Sevilay, K., Ali, C., Mehmet, C. Characteristics and Management of Children with COVID-19 in Turkey.doi:10. 4274/balkanmedj.galenos.2020.2020.7.52
9. Israel, V, Yogen, S., Joan Sanchez-de-Toledo. AEPC COVID-19 Rapid Response Tea A cute Cardiovascular Manifestations in 286 Children With Multisystem Inflammatory Syndrome Associated With COVID-19 Infection in Europe DOI: 10.1161/CIRCULATIONAHA.120. 050065 https://pubmed.ncbi.nlm.nih.gov/33166189/.
10. Liang, S., Xiang, M., Huafeng, Y., Zhaohua, Z., Pengfei, B., Yuling, H., Jing, S.,Yanqin, L, Chun, Y., Jin, G., Zhongfa, Z., Zhongtao, G. The different clinical characteristics of corona virus disease cases between children and their families in China the character of children with COVID-19 https://doi.org/10.1080/22221751.2020.1744483
11. Musaed, A., Yasser, M., Kazzaz, Tahir, H., Jubran, A., Hamad, A., Alaa A., Maria, A., Shahad, H., Mohammed, S., Sameera, M., Johania, A. SARS-CoV-2 infection in children, clinical characteristics, diagnostic findings and therapeutic interventions at a tertiary care center in Riyadh, Saudi Arabia doi: 10.1016/j.jiph.2020.12.034 https://www.ncbi.nlm.nih.gov/pmc/articles/ PMC 7833958/
12. Report on the Epidemiological Features of Coronavirus Disease 2019 (COVID-19). (2020). Outbreak in the Republic of Korea from January 19 to March 2. Prof Haiyan Qiu, MD Junhua Wu, MD Liang Hong, MD Yunling Luo, MD Prof Qifa Song, MSc Https://doi.org/10.3346/ jkms.2020. 35.e112.
13. Sourav, B., Aritra, G., Avishikta, D., Mousami, N., Rakesh, M. A India Preliminary Report of COVID-19 in Children in doi: 10.1007/s13312-020-2004-6.
14. Jiatong She Lanqin Liu Wenjun Liu COVID-19 epidemic: Disease characteristics in children First published: 31 March 2020 https://doi.org/10.1002/jmv.25807.
15. Ümumdünya Səhiyyə Təşkilatı (ÜST) COVID-19-u pandemiya kimi xarakterizə edir. (2020). Cenevrə, İsveç. https://www.who.int/emergencies/ diseases/novel-coronavirus-2019.
16. Yuanyuan, D., Xi, M., Yabin, H., Xin, Q., Fan, J., Zhongyi, J., Shilu, T. DOI: https://doi.org/10. 1542/peds.2020-0702.
17. Setareh Mamishiab Hosein Heydaric AlirezaAziz-Aharid Mohammad Reza Shokrollahic Babak Pourakbaria Shima Mahmoudia Zahra Movahedic. https://doi.org/10.1016/j.jmii.2020.07.019.
18. Kammoun, E., Masmoudi, K. (2020). A. links open overlay, R.Kammoun Person Envelope, Masmoudi, K. Paediatric aspects of COVID-19: An update. Respiratory Medicine and Research. Retrieved December 12, from https://www.sciencedirect.com/science/article/pii/ S25900412200300209
19. Arzu, D. (2020). 1: 36-41 https://dergi.yuksekihtisasuniversitesi.edu.tr/dosya1/ JYIUC1S1_36-41.pdf.

20. Arnaldo, B., Fernanda, S., Gustavo, R. Dos Santos et al. Brazilian Research Network in Pediatric Intensive Care, (BRnet-PIC) 27DOI: 10.1016 / j.jped.2020.07.002
21. Aline de Siqueira Alves Lopes, Sarah Cristina Fontes Vieira, Roseane Lima Santos Porto, Victor Santana Santos, Debora Cristina Fontes Leite, Luis Eduardo Cuevas, Ricardo Queiroz Gurgel Coronavirus disease-19 deaths among children ad adolecents in an area of Northeast, Brazil: ühy so many? Trop Med İnt Health.2021 Jan;26(1):115-119. Doi: 10.1111/tmi.13529.
22. William, O., Sarah, G., Leila, P., Louis,B., Susan, C., Julia, S., Rebecca, H., Audrey, O., Xianqun, L., Jeffrey, G. Author Notes. The Epidemiology of Severe Acute Respiratory Syndrome Coronavirus 2 in a Pediatric Healthcare Network in the United States doi: 10.1093/jpids/piaa074.
23. Epidemiological and clinical features of pediatric COVID-19 https://bmcmedicine.biomedcentral.com/articles/10.1186/s12916-020-01719-2
24. Virus Taxonomy King, A., Lefkowitz, E., Adams, M., Carstens, E. (2011). Virus Taxonomy: Ninth Report of the International Committee on Taxonomy of Viruses. Volume 9 Elsevier; Amsterdam, The Netherlands. https://books.google.az/books?hl=ru&lr=&id=aFYaE9KXEXUC &oi=fnd&pg= PP1&ots=uMfnPv8eXM&sig=ug0DEM84QM45hGfXHuy3UBtY5yo&redir_esc=y#v=onepage &q&f=false
25. Burcu, Y., Yasemin, O., Kubra, A., Pembe, O., Sibel, G., Sare, I., Musa, K., Sevilay, K., Ali, C., Mehmet, C. Characteristics and Management of Children with COVID-19 in Turkey doi: 10.4274/balkanmedj. galenos.2020.2020.7.52

**Rəyçi: b.ü.f.d. Şeyda Şıxəliyeva**

Göndərilib: 12.09.2022 Qəbul edilib: 03.11.2022

DOI: https://doi.org/10.36719/2707-1146/26/25-30

**Tarıverdi Allahverdi oğlu İslamzadə**
Əkinçilik Elmi-Tədqiqat İnstitutu
doktorant
islamzade@yahoo.com

# LƏNKƏRAN-ASTARA BÖLGƏSİNDƏ HƏŞİMİ ÇƏLTİK SORTUNUN KÜLƏŞ MƏHSULDARLIĞINA BECƏRMƏ AMİLLƏRİNİN TƏSİRİ

**Xülasə**

Məqalədə Lənkəran-Astara bölgəsinin suvarılan podzollu-qleyli-sarı torpaqlarında Həşimi çəltik sortunun küləş məhsuldarlığına becərmə amillərinin təsirinin nəticələri göstərilmişdir. Əkin müddəti, hektara şitil norması və qidalanma şəraiti çəltik məhsuldarlığı ilə yanaşı, gübrəsiz varianta nisbətən küləş məhsuldarlığını da artırıb. Həmçinin, üç illik tarla təcrübələrinin nəticələrinə əsasən, mayın 1-ci ongünlüyündə aparılan əkinlərdə "Həşimi" sortunun küləş məhsuldarlığının hər üç bitki sıxlığında və mineral gübrə normalarında artırılmasının, 3-cü ongünlüyündə isə aşağı salınmasının səbəbləri müəyyən edilmişdir. Mayın 3-cü ongünlüyündə aparılan əkinlərdə və hər üç şitil normasında bitki sıxlığından asılı olaraq, mayın 1-ci ongünlüyündə aparılan əkinlərə nisbətən əkilən çəltiyin küləş məhsuldarlığı xeyli aşağı olmuşdur.

***Açar sözlər:*** *torpaq, bitki, çəltik, gübrə, azot, məhsuldarlıq*

**Tariverdi Allahverdi Islamzade**
Research Institute of Crop Husbandry
doctoral student
islamzade@yahoo.com

## Effect of cultivation factors on straw yield of Hashemi rice variety in Lankaran-Astara region

**Abstract**

The article presents results of the effect of cultivation factors on straw yield of Shirudi paddy variety in irrigated podzol-gley-yellow soils of Lankaran-Astara region. It was noted that the planting time of seedlings, the seedlings rate per hectare and nutrition conditions, along with the paddy yield, also increased the straw yield compared to the non-fertilized variant. Also, based on the results of three years field experiments, the reasons for increasing the straw yield of Hashimi variety of paddy in all three plant densities and mineral fertilizer rates at seedlings planting in the 1st decade of May and decreasing it at planting in the $3^{rd}$ decade of May were explained in detail. The straw yield of paddy was significantly lower during the planting period of seedlings in the 3rd decade of May and in the all three seedlings rate per hectare, depending on the plant density, than planting in the 1st decade of May.

***Keywords:*** *soil, plant, paddy, fertilizer, nitrogen, productivity*

## Giriş

Respublika Dövlət Statistika Komitəsinin məlumatına görə 2020-ci ildə 3002 ha sahədə çəltik əkilmiş, 9922,6 ton məhsul istehsal edilmiş və orta məhsuldarlıq isə 32,8 s/ha təşkil etmişdir. Lənkəran-Astara iqtisadi rayonunda 1190 ha sahədən 4720,2 ton çəltik məhsulu istehsal edilmiş, orta məhsuldarlıq 35,9 s/ha, tədqiqat apardığımız Lənkəran rayonunda isə 731 ha sahədə çəltik əkilmiş, 2558,6 ton dən məhsulu istehsal edilmiş, orta məhsuldarlıq isə 35,0 s/ha, Astara rayonunda uyğun olaraq 205 ha; 843,6 ton; 41,2 s/ha, Masallıda 254 ha; 868,0 ton və 34,2 s/ha olmuşdur (1).

Bir çox xarici ölkə alimləri qeyd edirlər ki, dünya əhalisi 40 il müddətində 7,8 milyard nəfərdən artaraq 9 milyarda çatacaqdır. Gözlənilir ki, düyü insanların qida ilə təminatında əsas ərzaq bitkisi olacaqdır. Hal-hazırda yer kürəsi əhalisinin yarısının gündəlik kalorisinin 20% düyünün payına düşür. Ona görədə çəltiyin becərmə aqrotexnologiyasının elmi əsaslarla öyrənilməsi olduqca aktualdır (Price, 2013: 120-129; Norton, 2017: 98-112).

Çəltiyin əkilib becərilməsində əsas məqsəd yarma istehsalıdır. Yarma əsas ərzaq məhsulu olmaqla əhalinin qidalanmasında əvəzedilməz əhəmiyyətə malikdir. İstər dünya istərsədə Rusiya miqyasında çəltik əhalinin ərzaqla təminatında vacib bir bitkidir (Gospadinova, 2015: 78-79).

Çəltik (Oryza sativa L.) əsas ərzaq və kənd təsərrüfatı bitkisi olmaqla dünyanın bir çox ölkələrində becərilir. Dünyada çəltiyin əkin sahəsi 140 milyon ha, məhsul istehsalı isə 470 milyon tondan çoxdur. Rusiyada 2014-2015-ci illərdə 1079 min ton çəltik istehsal edilmişdir. Krımda 2014-cü ildə çəltiyin əkin sahəsi 18 min ha olmaqla yüksək məhsul istehsal edilmişdir. Çəltik ölkəni qiymətli qida məhsulu ilə təmin etməklə yanaşı, eyni zamanda torpaq mübitliyini yaxşılaşdırır (Yakubovskaya, 2017: 3).

Hal-hazırda çəltik dünyanın 112 ölkəsində 155 milyon ha sahədə becərilməklə, illik istehsalı 600 milyon tondur. Dünya bazarında FAO-nun məlumatına görə düyüyə olan tələbat 2,3% buğdaya nisbətən artıqdır və gözlənilən məhsuldarlıq bu tələbatı ödəmir (Rice in the Global Economy: Strategic Research and Policy Issues for Food Security, 2010: 487).

FAO-nun məlumatına görə 2016-cı ildə dünyada 742 541 804 tondan çox düyü istehsal edilmişdir. Düyü istehsalı Çində 211 090 813 ton, adambaşına 151,443 kq, əkin sahəsi 30 449 860 ha, orta məhsuldarlıq 6932,4 kq/ha, uyğun olaraq Hindistanda 158 756 871 ton; 118,787 kq; 42964980 ha; 3695,0 kq/ha İndoneziyada 77 297 509 ton; 291,672 kq; 142 752 111; 5414,8 kq/ha, Banqladeşdə 52 590 000 ton; 318,484 kq; 113 85 953 ha; 4618,8 kq/ha, Vyetnamda 43 437 229 ton; 458,876; 7783113; 5581,0 kq/ha, Braziliyada 10 622 189 ton; 50,695 kq, 1 943 938 ha; 5464,3 k/ha, ABŞ-da 10 167 050 ton; 165,656 kq; 4 556 043 ha; 3869,0 kq/ha, İranda 2 386 492 ton; 29,19 kq; 556787 ha; 4286,2 kq/ha, Pakistanda 10 412 155 ton; 51,578 kq; 2 765 559 ha; 3764,9, Türkiyədə 920 000 ton; 11,385 kq; 116056 ha; 7927,2 kq/ha, MDB ölkələrində Rusiyada 1 080 886 ton; 7,359 kq; 203 823 ha; 5303,1 kq/ha, Qazaxıstanda 447 830 ton; 24,509 kq; 94319 ha; 4748 kq/ha; Özbəkistanda 212 000 ton; 6,492 kq; 72300 ha; 2932,2 kq/ha, Tacikistanda 96476 ton; 10,802 kq; 3678 ha; 7053,4 kq/ha, Ukraynada 64 700 ton; 1,531 kq; 12 000 ha; 5391,7 kq/ha, Qırğısıstanda 34 847 ton; 5,523 kq; 9904 ha; 3518,5 kq/ha, Türkmənistanda 130 000 ton; 22,217 kq; 143 423 ha; 906,4 kq/ha, Azərbaycanda isə 5406 ton; 0,546 kq; 2510 ha və 2153,8 kq/ha təşkil etmişdir (7).

Xarici ölkə alimlərinin fikrincə çəltiyin qida dəyəri onun fiziki-kimyəvi, bioloji göstəricilərindən asılıdır, bu göstəriciləri isə mineral qidalanma ilə yüksəltmək mümükündür (Chanchan, Yuancai, Baoyan, Yan, Yun, Quan, Ruifeng, Shu, Fugen, 2018: 246). Onların fikrincə azotlu gübrələr məhsuldarlığı 80% artırır (Hiroe, Kunihiko, Toshihiko, Hiroyuki, Kaori, Hiroshi, 2016: 30-32).

Q.A.Qalkinin və V.A.Ladatkonun məlumatlarına görə 2016-cı ildə Rusiyanın Kuban vilayətində 142 min ha əkin sahəsindən 1,0 milyon ton düyü istehsal etmişdir. Çəltikçiliyi inkişaf etdirmək üçün orta məhsuldarlığı 7,1-7,2 t/ha-ya çatdırmaq lazımdır. Son 8 il ərzində çəltiyin stabil olaraq 6 t/ha 2016-cı ildə isə 7,0 t/ha təşkil etmişdir (Galkin, 2016: 63-71).

Son məlumatlara görə düyü istehsalı Kuban vilayətində 281,6 min ton, orta məhsuldarlıq isə 15,9 s/ha təşkil etmişdir (Malysheva, Pishchenko, 2019: 459-474).

Rusiyanın Krasnodar vilayətində baxmayaraq çəltikçilik daha çox xərc tələb edir, amma iqtisadi cəhətdən səmərəlidir. Əkin sahəsi 234,4 min ha-dır. Baxmayaraq ki, rayonlaşmış sortların potensial məhsuldarlığı 10-12 t/ha-dır, 2019-cu ildə orta məhsuldarlıq 6,46 t/ha olmuşdur. Bu fərqi aradan qaldırmaq üçün yeni becərmə texnologiyalarının tətbiqi və optimal qidalanma şəraitinin yaradılması ilə mümkündür (Petrik, 2019: 356-362: Sharma, 2014: 2898-2910; Sheudzhen, 2019: 512-527).

Bunları nəzərə alaraq tədqiqatın aparılmasında əsas məqsəd Lənkəran-Astara bölgəsinin suvarılan podzollu-qleyli-sarı torpaqlarında çəltik bitkisindən yüksək və keyfiyyətli məhsul alınmasını təmin edən səmərəli becərmə üsullarının-şitillərin basdırılma müddətinin, hektara şitil normasının və qidalanma şəraitinin işlənib hazırlanmasından və fermerlərə tövsiyyə edilməsindən ibarətdir.

Tədqiqatlar 2016-2018-ci illərdə Lənkəran rayonunun Siyavar kəndində yerləşən "Cənub Aqro MMC"-də qleyləşmiş podzollu-sarı torpaqlarda çəltiyin "Həşimi" sortu ilə aparılmışdır. Tarla təcrübələri 3 amilli olmaqla (2x3x3) aşağıdakı sxemdə qoyulmuşdur:

A amili-çəltik şitillərinin basdırılma müddəti:

1)Mayın 1-ci ongünlüyü;

2)Mayın 3-cü ongünlüyü;

B amili-hektara əkiləcək şitil norması (mln ədəd): 1,0; 1,7; 2,5;

C amili-qidalanma şəraiti: 1) Gübrəsiz; 2) $N_{90}P_{60}K_{40}$; 3) $N_{120}P_{80}K_{60}$

Hər variantın uçot bölməsinin sahəsi 54,0 $m^2$ (30x1,80 m) olmaqla, hazır şitillər cərgə üsulu ilə 4 təkrarda basdırılmışdır. Təcrübə sahəsində mineral gübrələrdən azot-ammonium nitrat 34,7%-li, fosfor-sadə superfosfat 18,7%-li və kalium-kalium sulfat 46%-li, fosfor və kalium 100%, azot 50% şitillər sahəyə basdırılmazdan əvvəl şum altına, azotun 50%-i kollanma fazasında yemləmə şəklində cərgə aralarına verilmişdir (Armor, 1985: 351).

Çəltik şitilləri sahəyə basdırılmazdan əvvəl sahənin 5 yerindən konvert formasında 0-25; 25-50; 50-70 sm dərinlikdən torpaq nümunələri götürülərək əsas aqrokimyəvi göstəriciləri təyin olunmuşdur.

Götürülmüş torpaq nümunələrində: pH potensiometrdə, humus İ.V.Tyurinə görə, udulmuş ammonyak azotu D.P.Konevə, nitrat azotu Qrandval-Lyaju, ümumi azot, ümumi fosfor K.E.Ginzburq və Q.M.Şeqlova, mütəhərrik fosfor B.P.Maçiqin üsulu ilə, ümumi kalium Smitə, mübadiləvi kalium B.P. Maçiqin üsulu ilə alovlu fotometrdə, bitki nümunələrində: ümumi azot, fosfor və kalium K.E.Ginzburq, Q.M.Şeqlova və E.V.Vulfusa görə təyin edilmişdir (Hacıməmmədov, 2016: 131).

Analiz nəticələrindən məlum olmuşdur ki, pH su məhlulunda 0-25 sm-lik qatda 5,2, 25-50 sm-lik qatda 5,4, 50-75 sm-lik qatda 5,6 olmuşdur. Humus, ümumi azot, fosfor və kalium 0-25 sm-lik qatda uyğun olaraq 3,12%; 0,17%; 0,28%; 2,28%, 25-50 sm-lik qatda uyğun olaraq 2,55%, 0,15%, 0,25%, 2,53%, aşağı qatlara getdikcə azalaraq 50-75 sm-lik qatda müvafiq olaraq 1,56%; 0,12%; 0,18%; 2,21% təşkil etmişdir. Udulmuş ammonyak azotu 0-25 və 50-75 sm-lik qatlar üzrə 35,3-15,5 mq/kq; nitrat azotu 7,6-3,5 mq/kq; mütəhərrik fosfor 35,6-24,3 mq/kq; mübadiləvi kalium isə 185,5-123,6 mq/kq arasında tərəddüd etmişdir (cədvəl-1).

**Cədvəl 1**

**Təcrübə sahəsinin torpaqlarının aqrokimyəvi xassələri**

| Dərinlik, (sm) | pH su məhlulunda | Humus, (%) | Azot | | | Fosfor | | Kalium | |
|---|---|---|---|---|---|---|---|---|---|
| | | | Ümumi, (%) | Udulmuş ammonyak, $N/NH_3$ (mq/kq) | Nitrat azotu, $N/NO_3$ (mq/kq) | Ümumi, (%) | Mütəhərrik, (mq/kq) | Ümumi, (%) | Mübadiləvi, (mq/kq) |
| 0-25 | 5,2 | 3,12 | 0,17 | 35,3 | 7,6 | 0,28 | 35,6 | 2,68 | 185,5 |
| 25-50 | 5,4 | 2,55 | 0,15 | 30,2 | 5,2 | 0,25 | 24,3 | 2,53 | 156,0 |
| 50-75 | 5,6 | 1,56 | 0,12 | 15,5 | 3,5 | 0,18 | 10,2 | 2,21 | 123,6 |

Beləliklə, Lənkəran rayonu şəraitində apardığımız aqrokimyəvi təhlillər göstərir ki, respublikamızda qəbul edilmiş qradasiyaya görə bu torpaqlar qida maddələri ilə yüksək dərəcədə təmin olunmamışdır. Ona görə də bu torpaqlarda çəltik bitkisinin böyüməsi, inkişafı, yüksək və keyfiyyətli məhsul verməsi və torpaq münbitliyinin qorunub saxlanması üçün mineral gübrələrin verilməsi olduqca vacibdir (Norton, 2017: 98-112).

Ekologiya və Təbii Sərvətlər Nazirliyinin Milli Hidrometeorologiya Departamentinin məlumatlarına əsasən 2016-2017-ci illərdə Lənkəran bölgəsində bitkinin vegetasiya müddətində düşən yağıntıların miqdarı verilmişdir (şəkil-1).

Şəkildə göründüyü kimi 2016-cı tədqiqat ilində aprel ayında yağmurların miqdarı 2017-ci ilə nisbətən aşağı olmuşdur. Avqust ayında hər iki tədqiqat ilində Lənkəran bölgəsində yağıntı müşahidə olunmamış, may, iyun, iyul aylarında isə 2016-cı məhsul ilində yağmurların miqdarı 2017-ci ilə nisbətən yüksək olmuşdur.




**Şəkil 1. 2016-2017-ci illərdə Lənkəran bölgəsində bitkinin vegetasiya müddətində düşən yağıntının miqdarı**

Cədvəl 2-dən göründüyü kimi çəltiyin küləş məhsuldarlığı mayın 1-ci ongünlüyündə şitillərin basdırılması müddətində və hektara 1,0 mln ədəd/ha şitil normasında nəzarət-gübrəsiz variantında 3 ildən orta olaraq küləş məhsulu 106,4 s/ha, mineral gübrələrin $N_{90}P_{60}K_{40}$ normasında 112,1 s/ha, artım nəzarət-gübrəsiz varianta nisbətən 5,7 s/ha və ya 5,3%, küləş məhsulunun yüksək miqdarı isə dən məhsulunda olduğu kimi $N_{120}P_{80}K_{60}$ variantında uyğun olaraq 123,2 s/ha; 16,8 s/ha və ya 15,8% olmuşdur. Ən yüksək küləş məhsulu hər üç variantda hektara şitil norması 1,7 mln ədəd olduqda alınmışdır. Belə ki, nəzarət-gübrəsiz variantında 3 ildən orta olaraq küləş məhsulu 112,5 s/ha, mineral gübrələrin $N_{90}P_{60}K_{40}$ normasında 124,3 s/ha, artım nəzarət-gübrəsiz varianta nisbətən 11,8 s/ha və ya 10,5%, yüksək miqdarı isə $N_{120}P_{80}K_{60}$ variantında müvafiq olaraq 156,4 s/ha; 43,9 s/ha və ya 39,1% olmuşdur.

**Cədvəl 2.**
**Becərmə amillərinin çəltiyin Şirudi sortunun küləş məhsuldarlığına təsiri (s/ha) (mayın 1-ci ongünlüyü)**

| Hektara şitil norması mln/ədəd | Qidalanma şəraiti | Mayın 1-ci ongünlüyü | | | Mayın 3-cü ongünlüyü | | |
|---|---|---|---|---|---|---|---|
| | | Küləş məhsuldarlığı s/ha | Artım | | Küləş məhsuldarlığı s/ha | Artım | |
| | | | s/ha | % | | % | s/ha |
| 1,0 | Gübrəsiz | 106,4 | - | - | 103,4 | - | - |
| | $N_{90}P_{60}K_{40}$ | 112,1 | 5,7 | 5,3 | 110,1 | 6,7 | 6,5 |
| | $N_{120}P_{80}K_{60}$ | 123,2 | 16,8 | 15,8 | 119,2 | 15,8 | 15,3 |
| 1,7 | Gübrəsiz | 112,5 | - | - | 106,5 | - | - |
| | $N_{90}P_{60}K_{40}$ | 124,3 | 11,8 | 10,5 | 110,3 | 3,8 | 3,6 |
| | $N_{120}P_{80}K_{60}$ | 156,4 | 43,9 | 39,1 | 150,4 | 43,9 | 41,2 |
| 2,5 | Gübrəsiz | 104,0 | - | - | 104,0 | - | - |
| | $N_{90}P_{60}K_{40}$ | 104,9 | 0,9 | 0,9 | 107,9 | 3,9 | 3,8 |
| | $N_{120}P_{80}K_{60}$ | 113,6 | 9,6 | 9,2 | 113,6 | 9,6 | 9,2 |

Ən az küləş məhsulu hektara şitil norması 2,5 mln ədəd olduqda alınmaqla, nəzarət-gübrəsiz variantında 3 ildən orta olaraq küləş məhsulu 104,0 s/ha, mineral gübrələrin $N_{90}P_{60}K_{40}$ normasında 104,9 s/ha, artım nəzarət-gübrəsiz varianta nisbətən 0,9 s/ha və ya 0,9%, yüksək miqdarı isə $N_{120}P_{80}K_{60}$ variantında uyğun olaraq 113,6 s/ha; 9,6 s/ha və ya 9,2% təşkil etmişdir.

Cədvəl-dən göründüyü kimi çəltiyin küləş məhsuldarlığı mayın 3-cü ongünlüyündə şitillərin basdırılma müddətində və hər üç hektara şitil normasından-bitki sıxlığından asılı olaraq mayın 1-ci ongünlüyünə nisbətən nəzərə çarpacaq dərəcədə az olmuşdur. Belə ki, hektara şitil norması 1,0 mln ədəd olan nəzarət-gübrəsiz variantında 3 ildən orta olaraq küləş məhsuldarlığı 103,4 s/ha, mineral gübrələrin $N_{90}P_{60}K_{40}$ normasında 110,1 s/ha, artım nəzarət-gübrəsiz varianta nisbətən 6,7 s/ha və ya 6,5%, yüksək miqdarı isə $N_{120}P_{80}K_{60}$ variantında uyğun olaraq 119,2 s/ha; 15,8 s/ha və ya 15,3% olmuşdur.

Ən yüksək küləş məhsulu mayın 1-ci ongünlüyündə aparılmış əkinlərdə olduğu kimi hektara şitil norması 1,7 mln ədəd olduqda alınmışdır. Belə ki, nəzarət-gübrəsiz variantında 3 ildən orta olaraq küləş məhsuldarlığı 106,5 s/ha, mineral gübrələrin $N_{90}P_{60}K_{40}$ normasında 110,3 s/ha, artım nəzarət-gübrəsiz varianta nisbətən 3,8 s/ha və ya 3,6%, yüksək miqdarı isə $N_{120}P_{80}K_{60}$ variantında uyğun olaraq 150,4 s/ha; 43,9 s/ha və ya 41,2% olmuşdur. Ən az küləş məhsulu isə hektara şitil norması 2,5 mln ədəd olduqda alınmaqla, nəzarət-gübrəsiz variantında 3 ildən orta olaraq küləş məhsulu 104,0 s/ha, mineral gübrələrin $N_{90}P_{60}K_{40}$ normasında 107,9 s/ha, artım nəzarət-gübrəsiz varianta nisbətən 3,9 s/ha və ya 3,8%, yüksək miqdarı isə $N_{120}P_{80}K_{60}$ variantında uyğun olaraq 113,6 s/ha; 9,6 s/ha və ya 9,2% təşkil etmişdir.

## Nəticə

Beləliklə, may ayının 1-ci ongünlüyündə şitilləri sahəyə basdırdıqda hər üç bitki sıxlığında və mineral gübrə normalarında çəltiyin Şirudi sortunun küləş məhsuldarlığı yüksəlmiş, mayın 3-cü ongünlüyündə isə azalmışdır. Ən yüksək küləş məhsulu hər iki şitillərin basdırılma müddətində hektara 1,7 milyon ədəd şitil normasında, ən az isə bitki sıxlığı daha çox olan hektara 2,5 mln ədəd şitil normasında mineral gübrələrin $N_{120}P_{80}K_{60}$ normasında alınmışdır.

## Ədəbiyyat

1. www.stat.gov.az
2. Price, A. (2013). Alternative wetting and drying irrigation for rice in Bangladesh: is it sustainable and has plant breeding something to offer? Price, A., Norton, G., Salt, D., Ebenhoeh, O., Meharg, A., Meharg, C., Islam, M., Sarma, R., Dasgupta, T., Ismail, A., McNally, K., Zhang, H., Dodd, I., Davies, W. Food and Energy Security. Vol. 2 (2) p.120-129.
3. Gospadinova, V. (2015). Rice production in the Russian Federation. V. Gospadinova, Rice growing. Krasnodar, No. 3-4 (28-29), p.78-79.
4. Yakubovskaya, A. (2017). Formation and functioning of the system of associative microorganisms-rice plants in meadow-chestnut soil: Abstract of the thesis. dissertation.s.kh. Sciences. Kazan, 25 p.
5. Rice in the Global Economy: Strategic Research and Policy Issues for Food Security. Edited by S.Pandey, D.Byerlee, D.Dawe, A.Dobermann, S.Mohanty, S.Rozelle, B.Hardy.IRRI, 2010. 487 p.
6. https://www.atlasbig.com / 2019
7. Chanchan, Z., Yuancai, H., Baoyan, Jia, Yan, W., Yun, W., Quan, X., Ruifeng, Li., Shu, W., Fugen, D. (2018). Effects of cuItivar, nitrogen rate, and pIanting density on reice-grain quality. Agronomy. № 8 (11). 246 p.
8. Hiroe, Y., Kunihiko, T., Toshihiko, K., Hiroyuki, O., Kaori, S., Hiroshi, N. (2016). Modeling the effects of N application on growth, yield and plant properties associated with the occurrence of chalky grains of rice. Plant Production Science. 19(1), p.30-42.
9. Galkin, G.(2016). Dependence of rice yield in the Kuban on agro-climatic factors: methodological and bibliographic aspects. Galkin, G., Ladatko, V. Rice growing. Krasnodar, No. 1-2 (30-31), p.63-71.
10. Malysheva, N., Pishchenko, D. (2019). Status and prospects for the development of rice seed

production in the Krasnodar Territory. Malysheva, N., Pishchenko, D. Krasnodar: Scientific journal of KubSAU. 121(07), p.459-474
11. Petrik, G. (2019). Analysis and assessment of the grain production sustainability. G.Petrik, A.Prudnikov. Annals of Agri Bio Research Volume 24, Issue 2, p.356-362.
12. Sharma, U. (2014). Chemical fractions of zinc and their contribution toward its availability under long-term integrated nutrient rice-wheat sequence in an acidic alfisol. U.Sharma, S.Subehia. Commun. Soil Sci. and Plant Anal. 45. № 22, p.2898-2910.
13. Sheudzhen, A. (2019). Chemicals-based regulation of leaves-to-grains outflow of assimilates to enhance yields in rice (Oryza sativa L.) under conditions of its northern area. A.Sheudzhen, T.Bondareva, P.Kharchenko, I.Doroshev. Sel'skokhozyaistvennaya Biologiya, 54(3), c.512-527.
14. Armor, B. (1985). Methods of field experience. M. Agro Promizdat, 351 p.
15. Hacıməmmədov, İ., Təlai, C., Kosayev, E. (2016). Torpaq, bitki və gübrələrin aqrokimyəvi analiz üsulları. "Müəllim" nəşriyyat, Bakı. 131 s.
16. Norton, G. (2017). Biomass and elemental concentrations of 22 rice cultivars grown under alternative wetting and drying conditions at three field sites in Bangladesh. Norton, G., Travis, A., Danku, J., Salt, D., Price, A., Hossain, M., Islam, M. Food and Energy Security. Vol. 6(3), p.98-112.

**Rəyçi: a.e.d. Yasin Kərimov**

Göndərilib: 01.09.2022 Qəbul edilib: 15.10.2022

DOI: https://doi.org/10.36719/2707-1146/26/31-35

**Vüqarə Həsən qızı Məmmədova**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
ms.vuqare@mail.ru
**Səbinə Sabir qızı İsmayılova**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
ismayilovasebine994@gmail.com
**Xəyalə Bəhman qızı Paşayeva**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
xeyalepaseyeva@gmail.com
**Könül Salman qızı Ələzova**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
konul.musayeva83@gmail.com
**Pərvin Mirağa oğlu Məmmədov**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
pervinmov@yandex.com

# DÜNYA ƏHALİSİ ARASINDA COVID-19-UN YAYILMASI VƏ EPİDEMİOLOJİ XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Ümümdünya Səhiyyə Təşkilatı (ÜST) 11 fevral 2020-ci ildə bu xəstəliyi Covid-19 adlandırdı. Beynəlxalq Viruslar Taksonomiyası Komitəsi (ICTV) tərəfindən SARS-CoV-2 kimi təsnif edildi. Ümumdünya Səhiyyə Təşkilatı (ÜST) 2020-ci il mart ayının 11-də koronavirusu pandemiya elan etdi. Bu məqalədə bəzi xarici ölkələrdə Covid 19-un epidemioloji xüsusiyyətləri barədə məlumatlar araşdırılmışdır.

XXI əsrdə insanlar yeni koronavirusla əlaqəli üç ölümcül pandemiyanın şahidi oldular: SARS (Ağır Kəskin Tənəffüs Sindromu), MERS (Orta Şərq Sindromu) və Covid-19 (SARS-COV-2). Bu virusların hamısı təbiəti baxımından olduqca yoluxucudur və kəskin tənəffüs yolu infeksiyalarına səbəb olur. Çinin Hubei əyalətinin Uhan şəhərində 2019-cu ilin dekabr ayında səbəbi naməlum olan pnevmoniya xəstə qurupu ortaya çıxdı.

***Açar sözlər:*** *Sars-cov-2, koronavirus, Covid-19, epidemiologiya, infeksiya*

**Vugara Hasan Mammadova**
V.Y.Akhundov Scientific-Research Medical Prophylaxis Institute
ms.vuqare@mail.ru
**Sabina Sabir Ismayilova**
V.Y.Akhundov Scientific-Research Medical Prophylaxis Institute
ismayilovasebine994@gmail.com
**Khayala Bahman Pashayeva**
V.Y.Akhundov Scientific-Research Medical Prophylaxis Institute
xeyalepaseyeva@gmail.com
**Konul Salman Alazova**
V.Y.Akhundov Scientific-Research Medical Prophylaxis Institute
konul.musayeva83@gmail.com
**Parvin Miragha Mammadov**
V.Y.Akhundov Scientific-Research Medical Prophylaxis Institute
pervinmov@yandex.com

## Prevalence and epidemiological characteristics of Covid-19 in the population around the world

### Abstract

The World Health Organization (WHO) named this disease as coronavirus disease 2019 (COVID-19) on February 11, 2020. The virus was classified as SARS-CoV-2 by the International Committee on Taxonomy of Viruses (ICTV). The World Health Organization (WHO) declared the coronavirus a pandemic on March 11, 2020. In this article, information on the epidemiological characteristics of Covid-19 in some foreign countries is examined. In the 21st century, people have witnessed three deadly pandemics related to the new coronavirus: SARS (Severe Acute Respiratory Syndrome), MERS (Middle East Syndrome) and Covid-19 (SARS-COV-2). All of these viruses are highly contagious and cause acute respiratory tract infections. In December 2019, an outbreak of pneumonia of unknown origin occurred in Wuhan, Hubei Province, China.

***Keywords:*** *Sars-cov-2, coronavirus, Covid-19, epidemiology, infection*

### Giriş

İlk vaxtlar bir sıra ölkələrdə bu xəstəliyə qanın seroloji testlərinə, klinik əlamətlərə və ağciyərlərin müayinəsinə əsaslanaraq virusa bağlı sətəlcəm kimi diaqnoz qoyulurdu. Epidemiyaya səbəb olan bu virusun heyvandan insana keçdiyi güman edilirdi. Lakin ilk Covid 19 xəstəliyinin hansı heyvandan insana yoluxduğu hələ də məlum deyil. SARS-CoV-2 adlandırılan virus SARS-CoV virusuna nisbətən simptomatik və asimptomatik gedişə malik olub daha tez yoluxma xüsusiyyətinə malikdir (Nursel, 2020: 14-27).

Ümumiyyətlə araşdırmalarda SARS-CoV-un heyvanlarda mutasiyaya uğramadan insanlara birbaşa yoluxa bilməyəcəyi düşünülür. Məsələn, SARS-CoV və MERS-CoV insanlara keçmədən əvvəl pişiklərə və dəvələrə yoluxduğu ehtimal olunur (Jin, Yang, Ji, 2020: 372). Ümümdünya Səhiyyə Təşkilatı (ÜST) 30 Yanvar 2020-ci il tarixinə qədər 10000 yoluxma və 200-dən çox ölüm sayı qeydə almışdır (Guyski, Raciborski, Janovski, 2020: 1-8).

Ümumdünya Səhiyyə Təşkilatı 31 Yanvar 2020-ci il tarixində Covid-19 infeksiyasını narahatlıq doğuran ictimai fövqəladə vəziyyət olduğunu elan etmişdir (Bulut, Kato 2020: 563-570). Filogenetik analiz göstərir ki, SARS-CoV-2 Coronaviridae ailəsinin yeni bir üzvüdür, lakin SARS-CoV (79%) və MERS-CoV (50%) bir-birindən fərqlənir. Covid-19 insanları xəstələndirən yeddinci koronavirus növüdür. 18 fevral 2020-ci il tarixinə qədər 26 ölkədə 73451 nəfər bu xəstəliyə yoluxmuş, onlardan 1875 nəfərdə infeksiya ölümə səbəb olmuşdur (Guyski, Raciborski, Janovski 2020: 1-8). Başlandığı tarixdən etibarən 100-dən çox ölkəyə yayılan Covid-19 infeksiyasının yoluxduğu insanların sayı çox yüksək həddə çatmışdır (Jin, Yang, Ji, 2020; Mark, Phil, David, 2020: 1194-1196; Vincent, Cheng, Shuk-Ching, Jonathan, 2020: 1-6).

Ümumdünya Səhiyyə Təşkilatı (ÜST) 11 mart 2020-ci il tarixində bu xəstəliyin yayılmasını pandemiya elan etdi (Khan, Adil, Alkhathlan, 2020: 39). Dünyanın 199 ölkəsində 800,000 yoluxma halı qeydə alınmışdır. Yoluxanların 39000-dən çoxunun həyatını itirdiyi, 141,000-nin sağaldığı bildirildi (Dhakal, Karki, 2020: 524). Təsdiqlənmiş infeksiya və ölüm hallarının sayı gündəlik olaraq artmaqda davam etdiyindən, virusun ötürülmə qanunauyğunluqları və xəstəliyin epidemiologiyasını dərindən dərk etmək çox vacibdir.

Xəstəliyin başlamasından qısa müddət keçməsinə baxmayaraq, virusun genom quruluşu və təkamülü, zülal əsaslı virus-insan qarşılıqlı əlaqələri haqqında bir çox maraqlı məlumatlar ortaya çıxmışdır (Guyski, Raciborski, Janovski, 2020: 1-8). Mövcud dəlillərə görə SARS-CoV-2-nin insana yoluxması hava, damcı və təmas yolu ilə baş verir (Shahrizad, Khoobmoradi, Erfani, 2020: 427).

Son vaxtlar müxtəlif yoluxucu xəstəliklərin baş verməsi milyonlarla insanın həyatına əhəmiyyətli dərəcədə təsir etmişdir. Bu xəstəliklər təkcə tibb işçilərinə və səhiyyə müəssisələrinə deyil, eyni zamanda iqtisadçılara, alimlərə və siyasətçilərə də maddi çətinliklər törətmişdir (Villalonga-Morales, 2020: 556-558).

2020-2021-ci illərdə Covid-19 xəstələri əsas infeksiya mənbəyi olmuşdur və ağır xəstələr yüngül xəstələrə nisbətən daha yoluxdurucu sayılırdı. Xəstəliyi asimptomatik keçirən şəxslər də infeksiya mənbəyi ola bilər. Yoluxmuş şəxs potensial olaraq virusu öz selikli qişasının yoluxmuş damcıları vasitəsilə ötürə bilər (Jin, Yang, Ji, 2020). Covid-19-un simptomlarının şiddəti mülayimdən kritik dərəcəyə qədər dəyişir. Bəzi hallarda isə xəstəlik asimptomatik keçir. Diaqnoz qoyulan xəstələrdə xəstəlik əksər hallarda yüngül və orta keçir. Xəstəxanaya yerləşdirilən xəstələrin 14%-nin oksigen dəstəyinə ehtiyacı olmuş, 5%-i isə reanimasiya şöbəsində müalicə almışdır (Khan, Adil, Alkhathlan, 2020: 39).

Bu xəstəlik başlayan zamandan bəri tənəffüs yolu xəstəlikləri içərisində əhəmiyyətli bir yer tutmuşdur. Daha çox diqqət yoluxma səviyyəsinə, xəstəxanaya yerləşdirmə, reanimasiya şöbəsinə müraciət, xəstəlik şiddəti, ölüm, infeksiyanın qarşısının alınması və müalicəsinə verilmişdir (Böhm, Wouldenberg, Chen, 2021). Covid 19-un klinik şiddəti 5 qrupda araşdırılmışdır (Bulut, Kato, 2020: 563-570). Xüsusilə yaşlı insanlar və bronxial astma, diabet, ürək-damar xəstəlikləri, xərçəng kimi xəstəlikləri olan insanlar SARS-COV-2 virusuna daha həssasdırlar (Vincent, Cheng, Şuk-Çinq., Jonathan, 2020: 1-6). İqlim faktorunun Covid-19-un şiddətinə təsir edən mühüm amillər arasında ola biləcəyi haqqında bəzi fikirlər var. Bu xəstəliyin isti Asiya ölkələrində Avropa və ABŞ-dan daha az yayıldığı müşahidə olunmuşdur (Jie, Daniel, Huang 2020: 1446-1458).

Covid-19 pandemiyası bölgələr arasında xəstə demoqrafiyası ilə yanaşı, tibb xidmətlərindən istifadəyə əlçatanlığın, səhiyyə sisteminin infrastrukturunun və pandemiyaya qarşı ölkələr arasındaki hazırlığın fərqliliklərini ortaya qoymuşdur. Bu amillər yalnız mövcud pandemiya üçün deyil, gələcəkdə yaranacaq qlobal hadisələr və pandemiyalarda səhiyyə siyasəti üçün vacibdir (Mohammad, Alyami, Naser, Mohamed, 2020: 506). SARS-CoV-2-ni xarakterizə edən erkən araşdırmalar gələcək epidemiyanın qarşısını almaq üçün yaxşı nəticə verə bilər. Bu, epidemiologiyaya nəzarət fəaliyyətinə dərhal başlamaq, ən təsirli yollarını seçmək və normal fəaliyyətin həddən artıq məhdudlaşdırılmasına səbəb ola biləcək müdaxilələrdən qaçınmağa kömək edəcəkdir (Marc, Phil, David, 2020: 1194-1196). Çinin demək olar ki, bütün əyalətlərində və dünyanın bir çox yerində, profilaktika və karantin mexanizmlərinin tətbiq olunduğuna baxmayaraq, SARS-CoV-2 infeksiyası hələ də yayılır və bu virus insanların sağlamlığı üçün təhlükə yaradır (Jin, Yang, Ji, 2020).

Bu icmalda Covid-19-un ötürülmə dinamikasını, həssaslığını təsvir edən, qiymətləndirən və erkən nəzarət tədbirlərinin in təsirini araşdıran tədqiqatlar təhlil edilmişdir. Məqalədə Covid-19 halları ilə əlqədar aşağıdaki kateqoriyalarla bağlı məlumat verilir: yeni təsdiqlənmiş yoluxmaların sayı, aktiv yoluxmaların sayı, kritik halların sayı, yaş qrupları və cins üzrə yoluxmaların faizi (Dhakal, Karki, 2020:n 524). Bu günə qədər Covid-19-un klinik diaqnozu üçün standart üsul burun və boğaz tampon nümunələrində və ya digər tənəffüs yolu nümunələrində virusun aşkarlanmasıdır (Semenova, Glushakova, Pivina, 2020: 227). Diaqnostik testlər üçün müasir, standartlara cavab verən laboratoriyalarda yuxarı və aşağı tənəffüs yolları nümunələri (bəlğəm, endotraxeal aspiratorlar və ya bronxoalveolyar yuma ilə alınmış yaxmalar) toplanılır (Park, Cook, Lim, 2020: 967).

Ümumiyyətlə, koronavirusların bu günə qədər insanda və heyvanlarda 23 növünün aşkarlanmasında PZR testindən istifadə olunmuşdur. PZR testinin müddəti istifadə olunan platformadan asılı olaraq 45 dəqiqədən 6 saata qədər dəyişir. Ümumdünya Səhiyyə Təşkilatı tərəfindən Covid-19 diaqnozunun təsdiqlənməsində "qızıl standart" kimi qəbul olunur (Mohammad, Alyami, Naser, Mohamed, 2020: 506). Aktiv Covid-19 xəstəsinin PZR test analizi negativ çıxana qədər xəstə nəzarət altında saxlanılır (Dhakal, Karki, 2020: 524).

Pandemiyanın yayılmasını qiymətləndirmək üçün 4 hissədən ibarət klassik SEIR metodundan istifadə edilir. S–həssas (həssas olanlar), E–məruz qalmış (yoluxmuş və simptomu olmayanlar), İ–yoluxmuş (xəstəlik simptomu olanlar), R–çıxarılan (sağalanlar və ölənlər) (Zhai, Ding, Wu, 2020: 105955). Bütün məlumatlar ardıcıl olaraq mövcud xəstələrdən toplanmışdır və xəstəxana məlumatlarına əsaslanır (Mohammed, Farah, Tahir, 2020: 526).

Bir sıra ölkələrdə aparılan tədqiqatlarda yaşından, cinsindən və irqindən asılı olmayaraq, yoluxmuş şəxslə yaxın təmasda olan əhalinin çox hissəsinin Covid-19-a qarşı həssas olduğu

göstərilir. İstənilən yaşda kişilər və qadınlar Covid-19-a yoluxur (Vincent, Cheng, Şuk-Çinq, Jonathan, 2020: 1-6). Yaş faktoru ilə birlikdə həmçinin ürək damar xəstəlikləri, şəkərli diabet və xroniki tənəffüs xəstəlikləri olan insanlarda xəstəliyin gedişatı ağır olur (Ho, Tsz Sum, Chi Hong, Wong, 2020: 51-58). Covid-19-un erkən yayılma dinamikasında aparılan bir araşdırmada ortalama inkubasiya müddətinin 2-5 gün olduğu müəyyənləşdirilmişdir. Nadir hallarda 19 günlük inkubasiya dövrünün olmasına baxmayaraq mütəxəssislər karantin müddətini 14 gün təyin ediblər (Kumar, İyengar, Vaish, 2020: 1037-1041).

**Nepalda** təsdiqlənmiş 1572 yoluxmanın 95%-dən çoxunun asimptomatik olduğu müəyyənləşdirilmişdir. Nepalda yoluxanların 92% kişilər olmuşdur. Bütün yoluxmalar arasında orta yaş 30 idi. Yoluxanların 8 nəfəri həyatını itirmişdir (0.5% ) (Dhakal, Karki, 2020: 524).

**Hong-kongda** 1084 təsdiqlənmiş yoluxmanın 588-i kişi və 496-ı qadın olmuşdur. 225 nəfərdə (20.8%) xəstəlik asimptomatik keçmişdir (Yeung, Sum, Hong, 2020: 51-58).

**Almaniyada** 3546 yoluxma arasında aparılan araşdırmada yoluxma hallarının 54%-i kişilərdə qeydə alınmışdır. Yoluxmaların ən böyük hissəsi 50-60 (23%) yaş arasında olmuşdur. Yoluxanların 728 nəfəri (38,2%) xarici ölkələrdə səyahətdə olarkən, yerdə qalan 1173 nəfər (61,8%) isə ölkədaxili səyahət zamanı yoluxmuşdur (Priya, Neeraj, Giridhara, 2020: 424-437).

**Hindistanda** 22 yanvar - 30 aprel 2020-ci il tarixləri arasında test nümunələrinin sayı 1,021,518 təşkil etmişdir. Aparılan müayinələr mart ayının əvvəllərində gündə 250 nəfər, 2020-ci il aprel ayının sonuna qədər isə gündə 50.000-ə qədər artmıışdır. 8 həftə ərzində yoxlanılan testlərdə 200 qat artım müşahidə olundu.Yaşa görə yoluxma sayları (1 milyon əhali üçün) 50-69 yaş arasında (orta yaş 63,3) ən yüksək, 10 yaşdan aşağı qruplar arasında isə ən aşağı idi (orta yaş 6,1) (Vijay, Karthikeyan, Abhishek, 2020: 1037-1041).

**Polşada** təsdiqlənmiş 1157 yoluxma arasında aparılan araşdırmada yoluxanların 50,5%-ni qadınlar təşkil etmişdir. Yaşa və cinsə görə 100,000 nəfərə düşən yoluxma nisbəti 20-29 yaş qrupunda - 4.0, 40-49 yaş qrupunda - 4.1, 50-59 yaş qrupunda - 4.3-ə bərabər idi. Ümumi yoluxma nisbəti 100000 sakinə 3.01 olmuşdur və kişilər arasında 3.09, qadınlar arasına 2.95 təşkil etmişdir. Tədqiqat dövründə Covid-19-un səbəb olduğu 16 təsdiqlənmiş ölüm hadisəsi təsdiq olmuşdur. Ölənlərin əksəriyyəti kişilərdir (81.2%). Ölən xəstələrin orta yaşı 65.5 (median 67.5) idi. Ölən qadınlar arasında orta yaş 59.3 (median 57), kişilər arasında isə orta yaş 66.5 (median 68) idi. Ölənlər arasında ən gənci 37 yaşında ən yaşlısı 84 yaşında idi (Guyski, Raciborski, Janovski, 2020: 1-8).

**Azərbaycanda** Covid-19 infeksiyası ilə bağlı vəziyyət Azərbaycan Respublikası Dövlət Statistika Komitəsinin yayımladığı son rəsmi statistikada qeyd olunmuşdur (21). Nəticələri pozitiv çıxmış 222437 nəfərin 122707 (55,1%) nəfəri qadın, 99730 (44,9%) nəfəri kişidir. 0-17 yaş arası uşaqlarda yoluxma sayı 21869-dir (9,8%). Yerdə qalan yoluxmalar yaşı 18-dən yuxarı olan şəxslərdə qeydə alınmışdır (Dövlət Statistika Komitəsi) (Mustafa, 2020: 6-11).

## Nəticə

Təhlil olunan araşdırmalar göstərir ki, 2019-cu ilin dekabr ayında Çinin Uhan şəhərində ortaya çıxan Covid-19 virusu hər irq, yaş və cins üçün təhlükəlidir. Araşdırmalar göstərir ki bu infeksiyaya yoluxanların çoxu bəzi ölkələrdə kişilər, bəzi ölkələrdə isə qadınlardır. Ən az yoluxma halları isə uşaqlarda rast gəlinir. Xəstəliyin şiddəti yüngüldən ağıra doğru artır və ölümlərin çoxu xəstəliyi ağır keçirənlərdə baş verir.

## Ədəbiyyat

1. Nursel, B. (2020). Bats and wildlife in the Covid-19 pandemic. Kirikkale. The voice of nature: pp.14-27.
2. Jin, Y., Yang, H., Ji, W. (2020). Virology, epidemiology, pathogenesis, and control of Covid-19. 12 (4). 372.
3. Gujski, M., Raciborski, F., Jankowski, M. (2020). Epidemiological analysis of the first 1389 cases of COVID-19 in Poland: A preliminary report. 26: e924702-1–e924702-8.
4. Bulut, C., Kato, Y. (2020). Epidemiology of Covid-19. 50 (3): 563-570.

5. Vincent, Cheng, Shuk-Ching, V., Jonathan, C. (2020). Escalating infection control response to the rapidly evolving epidemiology of the coronavirus disease 2019 (COVID-19) due to SARS-COV-2 in Hong Kong, s. 1-6.
6. Khan, M., Adil, S., Alkhathlan, H. (2020). Covid-19: A global challenge with old history, epidemiology and progress so far. 26 (1), 39;
7. Dhakal, S., Karki, S. (2020). Early epidemiological features of Covid-19 in Nepal and public health response, 524 p.
8. Shahriarirad, R., Khodamoradi, Z., Erfani, A. (2020). Epidemiological and clinical features of 2019 novel coronavirus diseases (COVID-19) in the south of Iran-BMC Infectious Diseases. 20, 427
9. Villalonga-Morales, A. (2020). Why is Covid-19 epidemics no so intense in Africa? 67(10): p. 556-558.
10. Bohm, S., Woudenberg, T., Chen, D. (2021). Epidemiology and transmission characteristics of early COVID-19 cases, 20 january - 19 March 2020, in Bavaria, Germany: Epidemiology & Infection.
11. Jie, L., Daniel, Q., Huang, M. (2020). Epidemiology of Covid-19: A systematic review and meta-analysis of, p. 1449-1458.
12. Mohammad, H., Alyami, A., Naser, Y., Mohamed, A. (2020). Epidemiology of Covid-19 in the Kingdom of Saudi Arabia: An ecological study. 8: 506 p.
13. Marc, L., Phil, D., David, L. (2020). Defining the epidemiology of Covid-19- studies needed: Nejm. 382: 1194-1196.
14. Semenova, Y., Glushkova, N., Pivina, L. (2020). Epidemiological characteristics and forecast of Covid-19 outbreak in the Republic of Kazakhstan. 35(24): 227 p.
15. Park, M., Cook, A., Lim, J. (2020). A systematic review of Covid-19 epidemiology based on current evidence. 9 (4), 967 p.
16. Zhai, P., Ding, Y., Wu, X. (2020). The epidemiology, diagnosis and treatment of COVID-19. 55(5): 105955.
17. Mohammed, U., Farah M., Tahir A. Rizvi. (2020). SARS-COV-2/COVID-19: Viral genomics, epidemiology, vaccines, and therapeutic interventions. 12(5): 526.
18. Ho, L., Tsz Sum, L., Chi Hong, Wong. (2020). The epidemiology of Covid-19 cases and the successful containment strategy in Hong Kong-January to May 2020. 98: p. 51-58.
19. Priya, A., Neeraj, A., Giridhara, R. (2020). Laboratory surveillance for SARS-COV-2 in India: Performance of testing & Descriptive Epidemiology of detected COVID-19, January 22 - April 30, 151(5): p. 424-437.
20. Vijay, J., Karthikeyan, I., Abhishek, V., (2020). Differential mortality in COVID-19 patients from India and Western countries. 14(5): p. 1037-1041.
21. Azərbaycan Respublikası Dövlət Statistika Komitəsi. İdarə sənədlərinin təsnifatı üzrə formanın kodu 03112220. Yoluxucu və parazitar xəstəliklər haqqında hesabat. https://web.eidss.az/
22. Mustafa, S. (2020). A Global Pandemic: COVID-19. Samsun Says Right Bil; 5(1): 6-11.

**Rəyçi: t.ü.f.d. Fəridə Heydərova**

Göndərilib: 04.09.2022 Qəbul edilib: 24.10.2022

## İÇİNDƏKİLƏR



İmzalandı: 18.11.2022
Formatı: 60/84, 1/8
H/n həcmi: 4.5 ç.v.
Sifariş: 598

---

“ZƏNGƏZURDA” çap evində çap olunub.
Ünvan: Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
“Azərbaycan” nəşriyyatı, 6-cı mərtəbə
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: zengezurda1868@mail.ru

